قُلْ اِنَّمَآ اُنْذِرُكُمْ بِالْوَحْيِۘ وَلَا يَسْمَعُ الصُّمُّ الدُّعَآءَ اِذَا مَا يُنْذَرُونَ ﴿٤٥﴾
Karlar, qorxudulduqları zaman çağırışı eşitməzlər! ← De: "Mən sizi ancaq vəhy ilə qorxuduram".

وَلَئِنْ مَسَّتْهُمْ نَفْحَةٌ مِنْ عَذَابِ رَبِّكَ لَيَقُولُنَّ يَا وَيْلَنَآ
mütləq deyəcəklər: "Vay halımıza! ← Həqiqətən, əgər Rəbbinin əzabından az bir şey onlara toxunsa,

اِنَّا كُنَّا ظَالِمِينَ ﴿٤٦﴾
Biz, doğrudan da, zalım olmuşuq."

وَنَضَعُ الْمَوَازِينَ الْقِسْطَ لِيَوْمِ الْقِيٰمَةِ فَلَا تُظْلَمُ نَفْسٌ شَيْـًٔا
Və heç kəsə zərrə qədər haqsızlıq edilməz. ← Qiyamət günü üçün ədalət tərəzilərini quraraq.

وَاِنْ كَانَ مِثْقَالَ حَبَّةٍ مِنْ خَرْدَلٍ اَتَيْنَا بِهَا وَكَفٰى بِنَا حَاسِبِينَ ﴿٤٧﴾
Haqq-hesab çəkməyə Biz kifayətik. ← Bir xardal dənəsi ağırlığında olsa belə onu gətirərik.

وَلَقَدْ اٰتَيْنَا مُوسٰى وَهٰرُونَ الْفُرْقَانَ وَضِيَآءً وَذِكْرًا لِلْمُتَّقِينَ ﴿٤٨﴾
Bir nur və müttəqilər üçün öyüd-nəsihət olaraq; ← Biz Musa və Haruna Furqanı vermişdik;

اَلَّذِينَ يَخْشَوْنَ رَبَّهُمْ بِالْغَيْبِ وَهُمْ مِنَ السَّاعَةِ مُشْفِقُونَ ﴿٤٩﴾
və onlar qiyamətdən lərzəyə gələrlər. ← O (müttəqilər) ki, görmədikləri halda öz Rəbbindən qorxarlar,

وَهٰذَا ذِكْرٌ مُبَارَكٌ اَنْزَلْنَاهُ اَفَاَنْتُمْ لَهُ مُنْكِرُونَ ﴿٥٠﴾
Siz onu inkarmı edirsiniz? ← Bu (Quran), nazil etdiyimiz mübarək bir Zikrdir (kitabdır).

وَلَقَدْ اٰتَيْنَآ اِبْرٰهِيمَ رُشْدَهُ مِنْ قَبْلُ وَكُنَّا بِهِ عَالِمِينَ ﴿٥١﴾
Və biz onu bilirdik. ← Daha əvvəl İbrahimə də doğru yolu vermişdik.

اِذْ قَالَ لِاَبِيهِ وَقَوْمِهِ مَا هٰذِهِ التَّمَاثِيلُ الَّتِيٓ اَنْتُمْ لَهَا عَاكِفُونَ ﴿٥٢﴾
"Sizin tapınıb durduğunuz bu heykəllər nədir?" ← Bir vaxt o, atasına və tayfasına demişdi:

قَالُوا وَجَدْنَآ اٰبَآءَنَا لَهَا عَابِدِينَ ﴿٥٣﴾
Onlar: "Biz atalarımızı onlara ibadət edən gördük!" - demişdilər.

قَالَ لَقَدْ كُنْتُمْ اَنْتُمْ وَاٰبَآؤُكُمْ فِي ضَلَالٍ مُبِينٍ ﴿٥٤﴾
(İbrahim onlara) demişdi: "And olsun ki, siz və atalarınız açıq-aşkar zəlalət içindəsiniz!"

قَالُوٓا اَجِئْتَنَا بِالْحَقِّ اَمْ اَنْتَ مِنَ اللَّاعِبِينَ ﴿٥٥﴾
yoxsa sən zarafat edirsən?" ← Onlar demişdilər: "Sən bizə haqqımı gətirdin,

قَالَ بَلْ رَبُّكُمْ رَبُّ السَّمٰوَاتِ وَالْاَرْضِ الَّذِي فَطَرَهُنَّ
göylərin və yerin Rəbbidir ki, onları yaratmışdır. ← (İbrahim) demişdi: "Xeyr, Rəbbiniz,

وَاَنَا عَلٰى ذٰلِكُمْ مِنَ الشَّاهِدِينَ ﴿٥٦﴾
Mən də buna şahidlik edənlərdənəm!

وَتَاللّٰهِ لَاَكِيدَنَّ اَصْنَامَكُمْ بَعْدَ اَنْ تُوَلُّوا مُدْبِرِينَ ﴿٥٧﴾
...siz dönüb getdikdən sonra! ← Allaha and olsun ki, bütlərinizə mütləq bir hiylə quracağam...

فَجَعَلَهُمْ جُذَاذًا اِلَّا كَبِيرًا لَهُمْ لَعَلَّهُمْ اِلَيْهِ يَرْجِعُونَ ﴿٥٨﴾
bəlkə, ona müraciət edərlər. ← (İbrahim), onların (bütlərin) böyüyü xaricindəkiləri parça-parça etdi ki,

قَالُوا مَنْ فَعَلَ هٰذَا بِاٰلِهَتِنَآ اِنَّهُ لَمِنَ الظَّالِمِينَ ﴿٥٩﴾
o, şübhəsiz ki, zalımlardandır!” ← Onlar dedilər: “Bunu tanrılarımıza kim edibsə,

قَالُوا سَمِعْنَا فَتًى يَذْكُرُهُمْ يُقَالُ لَهُ اِبْرٰهِيمُ ﴿٦٠﴾
(Onlardan bəziləri) dedilər: “İbrahim deyilən bir gəncin onları tənə etdiyini eşitmişik!”

قَالُوا فَاْتُوا بِهِ عَلٰٓى اَعْيُنِ النَّاسِ لَعَلَّهُمْ يَشْهَدُونَ ﴿٦١﴾
onlar şahidlik edə bilsinlər!” ← Onlar dedilər: “Onu camaatın gözü qabağına gətirin ki,

قَالُوٓا ءَاَنْتَ فَعَلْتَ هٰذَا بِاٰلِهَتِنَا يَٓا اِبْرٰهِيمُ ﴿٦٢﴾
“Ey İbrahim! Tanrılarımıza bunu sənmi etdin?” - dedilər.

قَالَ بَلْ فَعَلَهُ كَبِيرُهُمْ هٰذَا فَسْـَٔلُوهُمْ اِنْ كَانُوا يَنْطِقُونَ ﴿٦٣﴾
Əgər danışa bilirlərsə, özlərindən soruşun!”← (İbrahim) dedi: “Xeyr, onların bu böyüyü onu etmişdir.

فَرَجَعُوٓا اِلٰٓى اَنْفُسِهِمْ فَقَالُوٓا اِنَّكُمْ اَنْتُمُ الظَّالِمُونَ ﴿٦٤﴾
“Siz, doğrudan da, zalımlarsınız.” ← Beləcə onlar öz-özlərinə müraciətlə dedilər:

ثُمَّ نُكِسُوا عَلٰى رُؤُسِهِمْ لَقَدْ عَلِمْتَ مَا هٰٓؤُلَٓاءِ يَنْطِقُونَ ﴿٦٥﴾
“Sən bilirsən ki, bunlar danışmırlar!” ← Sonra öz başlarına (küfrlərinə) qayıdaraq (dedilər):

قَالَ اَفَتَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَا يَنْفَعُكُمْ شَيْـًٔا وَلَا يَضُرُّكُمْ ﴿٦٦﴾
sizə heç bir xeyir və zərər vermirlər?!← O dedi: “Elə isə, Allahı qoyub o şeyləremi ibadət edirsiniz ki,

اُفٍّ لَكُمْ وَلِمَا تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ اَفَلَا تَعْقِلُونَ ﴿٦٧﴾
Məgər, anlamırsınızmı?” ← Tfu sizə və Allahdan başqa ibadət etdiyiniz bütlərə!

قَالُوا حَرِّقُوهُ وَانْصُرُوٓا اٰلِهَتَكُمْ اِنْ كُنْتُمْ فَاعِلِينَ ﴿٦٨﴾
və tanrılarınıza kömək edin, əgər bir iş görəcəksinizsə!” ← Onlar dedilər: “Onu (İbrahimi) yandırın,

قُلْنَا يَا نَارُ كُونِي بَرْدًا وَسَلَامًا عَلٰٓى اِبْرٰهِيمَ ﴿٦٩﴾
İbrahimə qarşı sərin və zərərsiz ol!” ← Biz də dedik: “Ey atəş!

وَاَرَادُوا بِهِ كَيْدًا فَجَعَلْنَاهُمُ الْاَخْسَرِينَ ﴿٧٠﴾
Biz isə onları daha çox ziyana uğratdıq. ← Onlar ona (İbrahimə) hiylə qurmaq istədilər.

وَنَجَّيْنَاهُ وَلُوطًا اِلَى الْاَرْضِ الَّتِي بَارَكْنَا فِيهَا لِلْعَالَمِينَ ﴿٧١﴾
hansı ki, oranı aləmlər üçün mübarək etmişdik. ← Biz onu (İbrahimi) da, Lutu da bir yerə qovuşdurduq;

وَوَهَبْنَا لَهُ اِسْحٰقَ وَيَعْقُوبَ نَافِلَةً وَكُلًّا جَعَلْنَا صَالِحِينَ ﴿٧٢﴾
Hamısını da saleh kimsələr etdik. ← Biz ona (İbrahimə) İshaqı və üstəlik Yəqubu bəxş etdik.

وَجَعَلْنَاهُمْ اَئِمَّةً يَهْدُونَ بِاَمْرِنَا وَاَوْحَيْنَٓا اِلَيْهِمْ

Biz onlara vəhy etdik; ← Biz onları əmrimizlə, (insanları) doğru yola aparan imamlar (rəhbərlər) etdik.

فِعْلَ الْخَيْرَاتِ وَاِقَامَ الصَّلٰوةِ وَاِيتَٓاءَ الزَّكٰوةِ وَكَانُوا لَنَا عَابِدِينَ ﴿٧٣﴾

Onlar Bizə ibadət edirdilər. ← xeyirli işlər görməyi, namaz qılmağı və zəkat verməyi.

وَلُوطًا اٰتَيْنَاهُ حُكْمًا وَعِلْمًا وَنَجَّيْنَاهُ مِنَ الْقَرْيَةِ الَّتِي كَانَتْ تَعْمَلُ الْخَبَٓائِثَ

Onu, çirkin işlər görən bir məmləkətdən xilas etdik. ← Luta da bir hökm və elm verdik.

اِنَّهُمْ كَانُوا قَوْمَ سَوْءٍ فَاسِقِينَ ﴿٧٤﴾

Həqiqətən, onlar pis, fasiq bir tayfa idilər.

وَاَدْخَلْنَاهُ فِي رَحْمَتِنَاۜ اِنَّهُ مِنَ الصَّالِحِينَ ﴿٧٥﴾

O həqiqətən, saleh kimsələrdəndi. ← Biz onu mərhəmətimizə qovuşdurduq.

وَنُوحًا اِذْ نَادٰى مِنْ قَبْلُ فَاسْتَجَبْنَا لَهُ

Biz də onun duasını qəbul etmişdik. ← (Ey Rəsulum!) Nuhu da (yad et)! O daha öncə yalvarmışdı.

فَنَجَّيْنَاهُ وَاَهْلَهُ مِنَ الْكَرْبِ الْعَظِيمِ ﴿٧٦﴾ وَنَصَرْنَاهُ مِنَ الْقَوْمِ الَّذِينَ كَذَّبُوا بِاٰيَاتِنَاۜ

Ayələrimizi yalanlayan bir qövmə qarşı da ona yardım etdik.← Onu və ailəsini böyük fəlakətdən qurtardıq!

اِنَّهُمْ كَانُوا قَوْمَ سَوْءٍ فَاَغْرَقْنَاهُمْ اَجْمَعِينَ ﴿٧٧﴾

Buna görə də, onların hamısını (suya) qərq etdik. ← Onlar, həqiqətən, pis bir camaat idilər.

وَدَاوُدَ وَسُلَيْمٰنَ اِذْ يَحْكُمَانِ فِي الْحَرْثِ

Bir zaman, o ikisi bir əkin sahəsi haqqında hökm verirdilər. ← Davudu və Süleymanı da (yad et)!

اِذْ نَفَشَتْ فِيهِ غَنَمُ الْقَوْمِۚ وَكُنَّا لِحُكْمِهِمْ شَاهِدِينَ ﴿٧٨﴾

Biz də onların hökmünə şahid idik. ← Beləki, bir tayfanın qoyunları (girib) oranı xarab etmişdi.

فَفَهَّمْنَاهَا سُلَيْمٰنَۚ وَكُلًّا اٰتَيْنَا حُكْمًا وَعِلْمًاۘ

və hər birinə hökm və elm verdik. ← Biz də onu (onların hökmünü) Süleymana anlatdıq,

وَسَخَّرْنَا مَعَ دَاوُدَ الْجِبَالَ يُسَبِّحْنَ وَالطَّيْرَۜ وَكُنَّا فَاعِلِينَ ﴿٧٩﴾

Axı (bunları) Biz edirdik. ← Dağları və quşları Davudla birlikdə (Allahı) təsbih etsinlər deyə ram etdik.

وَعَلَّمْنَاهُ صَنْعَةَ لَبُوسٍ لَكُمْ لِتُحْصِنَكُمْ مِنْ بَاْسِكُمْۚ

sizi (döyüşün) çətinliyindən qorusun. ← Sizin üçün ona (Davuda), zireh (düzəltmə) sənətini öyrətdik ki,

فَهَلْ اَنْتُمْ شَاكِرُونَ ﴿٨٠﴾ وَلِسُلَيْمٰنَ الرِّيحَ عَاصِفَةً

Şiddətli küləyi də Süleymana (ram etdik ki), ← Bəs siz şükür edirsinizmi?

تَجْرِي بِاَمْرِهِٓ اِلَى الْاَرْضِ الَّتِي بَارَكْنَا فِيهَاۜ وَكُنَّا بِكُلِّ شَيْءٍ عَالِمِينَ ﴿٨١﴾

Axı biz hər şeyi bilənik! ← onun əmri ilə bərəkət verdiyimiz yerə doğru əsər.

وَمِنَ الشَّيَاطِينِ مَنْ يَغُوصُونَ لَهُ وَيَعْمَلُونَ عَمَلًا دُونَ ذٰلِكَ

və ondan başqa işlər görənlər (vardı). ← Şeytanlardan da, onun üçün dənizə dalan,

وَكُنَّا لَهُمْ حَافِظِينَ ﴿٨٢﴾ وَاَيُّوبَ اِذْ نَادٰى رَبَّهُ

Əyyubu da (yada sal)! Bir vaxt o, Rəbbinə yalvarmıdı ki: ← Biz onlara göz-qulaq olurduq.

اَنّي مَسَّنِيَ الضُّرُّ وَاَنْتَ اَرْحَمُ الرَّاحِمِينَ ﴿٨٣﴾

Sən isə rəhmlilərin ən rəhmlisisən!" ← "Mənə bəla üz verdi.

فَاسْتَجَبْنَا لَهُ فَكَشَفْنَا مَا بِهِ مِنْ ضُرٍّ

və onu, düçar olduğu bəladan qurtardıq.← Onun duasını qəbul etdik,

وَاٰتَيْنَاهُ اَهْلَهُ وَمِثْلَهُمْ مَعَهُمْ رَحْمَةً مِنْ عِنْدِنَا وَذِكْرٰى لِلْعَابِدِينَ ﴿٨٤﴾

qatımızdan bir rəhmət və ibadət edənlərə ibrət kimi!←Ailəsini və onlarla birlikdə bir o qədərini ona qaytardıq;

وَاِسْمٰعِيلَ وَاِدْرِيسَ وَذَا الْكِفْلِ كُلٌّ مِنَ الصَّابِرِينَ ﴿٨٥﴾

Hər biri səbr edən kimsələrdəndi. ← (Ey Rəsulum!) İsmaili, İdrisi və Zülkifli də (yad et)!

وَاَدْخَلْنَاهُمْ فِي رَحْمَتِنَا اِنَّهُمْ مِنَ الصَّالِحِينَ ﴿٨٦﴾

Onlar doğrudan da, saleh bəndələrdəndilər. ← Biz onları mərhəmətimizə qovuşdurduq.

وَذَا النُّونِ اِذْ ذَهَبَ مُغَاضِبًا فَظَنَّ اَنْ لَنْ نَقْدِرَ عَلَيْهِ

və ona gücümüzün çatmayacağını zənn etmişdi.← Zün-Nunu (Yunisi də yad et)! Bir vaxt, qəzəblənib getmişdi

فَنَادٰى فِي الظُّلُمَاتِ اَنْ لَٓا اِلٰهَ اِلَّا اَنْتَ

"(Ey Rəbbim!) Səndən başqa heç bir tanrı yoxdur. ← Amma qaranlıqlar içində (belə dua etmişdi) ki:

سُبْحَانَكَ اِنّي كُنْتُ مِنَ الظَّالِمِينَ ﴿٨٧﴾

Sən paksan! Mən həqiqətən, zalımlardan olmuşam."

فَاسْتَجَبْنَا لَهُ وَنَجَّيْنَاهُ مِنَ الْغَمِّ وَكَذٰلِكَ نُنْجِي الْمُؤْمِنِينَ ﴿٨٨﴾

Möminlərə belə nicat veririk! ← Onun duasını qəbul etdik və onu qəmdən qurtardıq.

وَزَكَرِيَّٓا اِذْ نَادٰى رَبَّهُ رَبِّ لَا تَذَرْنِي فَرْدًا

"Ey Rəbbim! Məni tək buraxma! ← Zəkəriyyanı da (yada sal)! Bir vaxt Rəbbinə yalvarmışdı ki:

وَاَنْتَ خَيْرُ الْوَارِثِينَ ﴿٨٩﴾

Axı, Sən varislərin ən yaxşısısan!"

فَاسْتَجَبْنَا لَهُ وَوَهَبْنَا لَهُ يَحْيٰى وَاَصْلَحْنَا لَهُ زَوْجَهُ

Zövcəsini də, onun üçün (uşaq doğmağa) qadir etdik. ← Onun duasını qəbul etdik və ona Yəhyanı bəxş etdik.

اِنَّهُمْ كَانُوا يُسَارِعُونَ فِي الْخَيْرَاتِ وَيَدْعُونَنَا رَغَبًا وَرَهَبًا وَكَانُوا لَنَا خَاشِعِينَ ﴿٩٠﴾

və Bizə qarşı hörmətkar idilər. ← ümid və qorxu ilə Bizə dua edirdilər,← Onlar xeyirli işlər görməyə tələsirdilər,

وَالَّتِيٓ اَحْصَنَتْ فَرْجَهَا فَنَفَخْنَا فِيهَا مِنْ رُوحِنَا

Öz ruhumuzdan ona üfürdük. ← İsmətini qoruyanı da (Məryəmi də yad et)!

وَجَعَلْنَاهَا وَابْنَهَآ اٰيَةً لِلْعَالَمِينَ ﴿٩١﴾

Onu və oğlunu (İsanı) aləmlər üçün bir möcüzə etdik.

اِنَّ هٰذِهٖٓ اُمَّتُكُمْ اُمَّةً وَاحِدَةً وَاَنَا۬ رَبُّكُمْ فَاعْبُدُونِ ﴿٩٢﴾

Mən də sizin Rəbbinizəm. Elə isə, Mənə ibadət edin! ← Həqiqətən, bu tək bir ümmət sizin ümmətinizdir.

وَتَقَطَّعُوٓا اَمْرَهُمْ بَيْنَهُمْ كُلٌّ اِلَيْنَا رَاجِعُونَ ﴿٩٣﴾

Hamısı Bizim hüzurumuza qayıdacaqlar. ← Amma (insanlar) öz aralarında işlərini parçaladılar.

فَمَنْ يَعْمَلْ مِنَ الصَّالِحَاتِ وَهُوَ مُؤْمِنٌ فَلَا كُفْرَانَ لِسَعْيِهٖۚ

onun zəhməti danılmayacaqdır. ← Kim mömin olub yaxşı işlər görərsə,

وَاِنَّا لَهُ كَاتِبُونَ ﴿٩٤﴾

Şübhəsiz ki, Biz onun üçün (əməllərini) yazırıq.

وَحَرَامٌ عَلٰى قَرْيَةٍ اَهْلَكْنَاهَآ اَنَّهُمْ لَا يَرْجِعُونَ ﴿٩٥﴾

Məhv etdiyimiz məmləkətlərə qadağa qoyulmuşdur. Çünki onlar geri qayıtmayacaqlar.

حَتّٰٓى اِذَا فُتِحَتْ يَاْجُوجُ وَمَاْجُوجُ وَهُمْ مِنْ كُلِّ حَدَبٍ يَنْسِلُونَ ﴿٩٦﴾

onlar hər tərəfdən sürətlə axışdıqlarında; ← Nəhayət, Yəcuc və Məcuc (səddi) açılıb,

وَاقْتَرَبَ الْوَعْدُ الْحَقُّ فَاِذَا هِيَ شَاخِصَةٌ اَبْصَارُ الَّذِينَ كَفَرُوا

kafir olanlar, gözləri bərəlib dərhal (deyərlər): ← Haqq olan vəd yaxınlaşdıqda,

يَا وَيْلَنَا قَدْ كُنَّا فِي غَفْلَةٍ مِنْ هٰذَا بَلْ كُنَّا ظَالِمِينَ ﴿٩٧﴾

Xeyr, biz zalım olmuşuq.” ← “Vay halımıza! Biz bundan qafil idik.

اِنَّكُمْ وَمَا تَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ حَصَبُ جَهَنَّمَ اَنْتُمْ لَهَا وَارِدُونَ ﴿٩٨﴾

Siz ora girəcəksiniz! ← Siz və Allahdan qeyri ibadət etdikləriniz isə cəhənnəm yanacağısınız.

لَوْ كَانَ هٰٓؤُلَٓاءِ اٰلِهَةً مَا وَرَدُوهَاۜ وَكُلٌّ فِيهَا خَالِدُونَ ﴿٩٩﴾

Hamısı da orada əbədi qalacaqlar. ← Əgər bunlar tanrı olsaydılar, ora girməzdilər.

لَهُمْ فِيهَا زَفِيرٌ وَهُمْ فِيهَا لَا يَسْمَعُونَ ﴿١٠٠﴾

Və onlar orada heç nə eşitməzlər. ← Onlar üçün orada inilti vardır.

اِنَّ الَّذِينَ سَبَقَتْ لَهُمْ مِنَّا الْحُسْنٰىٓ اُو۬لٰٓئِكَ عَنْهَا مُبْعَدُونَ ﴿١٠١﴾

onlar oradan uzaqlaşdırılacaqlar. ← Bizdən özlərinə ən gözəl (nemət) təqdir edilmiş kəslərə gəlincə,

لَا يَسْمَعُونَ حَسِيسَهَا وَهُمْ فِي مَا اشْتَهَتْ اَنْفُسُهُمْ خَالِدُونَ ﴿١٠٢﴾

və ürəklərinin istədiyi (nemətlər) içində əbədi qalacaqlar.← Onun (Cəhənnəmin) uğultusunu eşitməyəcəklər

لَا يَحْزُنُهُمُ الْفَزَعُ الْاَكْبَرُ وَتَتَلَقّٰيهُمُ الْمَلٰٓئِكَةُ

Mələklər isə onları qarşılayıb (deyəcəklər): ← Onları, ən böyük qorxu kədərləndirməyəcək.

هٰذَا يَوْمُكُمُ الَّذِي كُنْتُمْ تُوعَدُونَ ﴿١٠٣﴾

"Bu, sizə vəd olunmuş gününüzdür!"

يَوْمَ نَطْوِي السَّمَٓاءَ كَطَيِّ السِّجِلِّ لِلْكُتُبِ كَمَا بَدَاْنَٓا اَوَّلَ خَلْقٍ نُعِيدُهُ

İlk dəfə yaratdığımız kimi, onu əvvəlki halına salarıq. ← O gün göyü, kitab səhifəsi kimi bükərik.

وَعْدًا عَلَيْنَا اِنَّا كُنَّا فَاعِلِينَ ﴿١٠٤﴾

Biz yerinə yetirməli olduğumuz vədi yerinə yetirəcəyik.

وَلَقَدْ كَتَبْنَا فِي الزَّبُورِ مِنْ بَعْدِ الذِّكْرِ اَنَّ الْاَرْضَ يَرِثُهَا عِبَادِيَ الصَّالِحُونَ ﴿١٠٥﴾

o yerə Mənim saleh bəndələrim varis olacaq! ← Zikrdən sonra Zəburda da yazmışdıq ki,

اِنَّ فِي هٰذَا لَبَلَاغًا لِقَوْمٍ عَابِدِينَ ﴿١٠٦﴾

Həqiqətən, bunda, ibadət edən bir ümmət üçün bir bildiriş vardır.

وَمَٓا اَرْسَلْنَاكَ اِلَّا رَحْمَةً لِلْعَالَمِينَ ﴿١٠٧﴾ قُلْ اِنَّمَا يُوحٰٓى اِلَيَّ

De: "Mənə, həqiqətən, vəhy olunur ki:← (Ey Rəsulum!) Səni aləmlər üçün ancaq bir rəhmət olaraq göndərdik.

اَنَّمَٓا اِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌ فَهَلْ اَنْتُمْ مُسْلِمُونَ ﴿١٠٨﴾

İndi siz müsəlman olacaqsınızmı?" ← "Sizin tanrınız ancaq bir olan tanrıdır (Allahdır).

فَاِنْ تَوَلَّوْا فَقُلْ اٰذَنْتُكُمْ عَلٰى سَوَٓاءٍ

"(Mənə vəhy olunanı) sizə, olduğu kimi bildirdim. ← (Ey Rəsulum!) Əgər onlar üz döndərsələr de:

وَاِنْ اَدْرٖٓي اَقَرِيبٌ اَمْ بَعِيدٌ مَا تُوعَدُونَ ﴿١٠٩﴾

sizə vəd olunan şey yaxındırmı yoxsa uzaq. ← Mən bilmirəm ki,

اِنَّهُ يَعْلَمُ الْجَهْرَ مِنَ الْقَوْلِ وَيَعْلَمُ مَا تَكْتُمُونَ ﴿١١٠﴾

gizlətdiklərinizi də bilir! ← Şübhəsiz ki, O (Allah), ucadan deyilən sözü də bilir,

وَاِنْ اَدْرٖي لَعَلَّهُ فِتْنَةٌ لَكُمْ وَمَتَاعٌ اِلٰى حٖينٍ ﴿١١١﴾

və bir müddət (sizə) gün-güzəran vermək üçündür". ← Bilmirəm. Bəlkə, o sizin üçün bir imtahandır,

قَالَ رَبِّ احْكُمْ بِالْحَقِّ وَرَبُّنَا الرَّحْمٰنُ الْمُسْتَعَانُ عَلٰى مَا تَصِفُونَ ﴿١١٢﴾

Dediklərinizə qarşı kömək diləniləsi, Rəhman olan Rəbbimizdir!" ← O dedi: "Ey Rəbbim! Haqq ilə hökm et.

# ﴿٢٢﴾ سُورَةُ الْحَجِّ

**əl-Həcc (Həcc) surəsi**

**(Mədinədə nazil olmuşdur, 78 ayədir)**

بِسْمِ اللّٰهِ الرَّحْمٰنِ الرَّحِيمِ

يَٓا اَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمْ اِنَّ زَلْزَلَةَ السَّاعَةِ شَيْءٌ عَظِيمٌ ﴿١﴾
Həqiqətən, qiyamətin zəlzələsi dəhşətli şeydir! ← Ey insanlar! Rəbbinizdən qorxun.

يَوْمَ تَرَوْنَهَا تَذْهَلُ كُلُّ مُرْضِعَةٍ عَمَّٓا اَرْضَعَتْ وَتَضَعُ كُلُّ ذَاتِ حَمْلٍ حَمْلَهَا
Hər bir hamilə qadın uşağını salar. ← O gün görərsən ki, hər bir əmzikli qadın əmizdirdiyini unudar.

وَتَرَى النَّاسَ سُكَارٰى وَمَا هُمْ بِسُكَارٰى وَلٰكِنَّ عَذَابَ اللّٰهِ شَدِيدٌ ﴿٢﴾
Ancaq Allahın əzabı çox şiddətlidir! ← Və insanları sərxoş görərsən. Halbuki onlar sərxoş deyillər.

وَمِنَ النَّاسِ مَنْ يُجَادِلُ فِي اللّٰهِ بِغَيْرِ عِلْمٍ وَيَتَّبِعُ كُلَّ شَيْطَانٍ مَرِيدٍ ﴿٣﴾
və hər inadkar şeytana uyar.← bir şey bilmədən Allah haqqında mübahisə edər,← İnsanlardan kimisi də,

كُتِبَ عَلَيْهِ اَنَّهُ مَنْ تَوَلَّاهُ
Şübhəsiz, kim onunla dostluq etsə, ← Onun (Şeytanın) haqqında (əzəldən belə) yazılmışdır:

فَاَنَّهُ يُضِلُّهُ وَيَهْدِيهِ اِلٰى عَذَابِ السَّعِيرِ ﴿٤﴾
şübhəsiz, o (Şeytan) onu yoldan çıxardıb cəhənnəm əzabına sürükləyər.

يَٓا اَيُّهَا النَّاسُ اِنْ كُنْتُمْ فِي رَيْبٍ مِنَ الْبَعْثِ
Əgər yenidən dirilməkdən şübhə edirsinizsə (yada salın ki), ← Ey insanlar!

فَاِنَّا خَلَقْنَاكُمْ مِنْ تُرَابٍ ثُمَّ مِنْ نُطْفَةٍ ثُمَّ مِنْ عَلَقَةٍ
sonra mənidən (nütfədən), sonra laxtalanmış qandan, ← həqiqətən, Biz sizi torpaqdan yaratdıq,

ثُمَّ مِنْ مُضْغَةٍ مُخَلَّقَةٍ وَغَيْرِ مُخَلَّقَةٍ لِنُبَيِّنَ لَكُمْ
(qüdrətimizi) sizə göstərək. ← sonra tam bir şəklə düşmüş və düşməmiş bir parça ətdən (yaratdıq ki),

وَنُقِرُّ فِي الْاَرْحَامِ مَا نَشَٓاءُ اِلٰٓى اَجَلٍ مُسَمًّى ثُمَّ نُخْرِجُكُمْ طِفْلًا
Sonra sizi uşaq olaraq (doğurub) çıxardarıq. ← İstədiyimizi ana bətnində müəyyən bir müddətədək saxlayarıq.

ثُمَّ لِتَبْلُغُوٓا اَشُدَّكُمْ وَمِنْكُمْ مَنْ يُتَوَفّٰى
Sizdən eləsi vəfat edər, ← Sonra yetkinlik çağına yetişməniz üçün (sizi böyüdərik).

وَمِنْكُمْ مَنْ يُرَدُّ اِلٰٓى اَرْذَلِ الْعُمُرِ لِكَيْلَا يَعْلَمَ مِنْ بَعْدِ عِلْمٍ شَيْـًٔا
əvvəldən bildiyi halda heç bir şey bilməz olar. ← sizdən eləsi də ömrünün ən rəzil çağına çatdırılar ki,

وَتَرَى الْاَرْضَ هَامِدَةً فَاِذَٓا اَنْزَلْنَا عَلَيْهَا الْمَٓاءَ
Biz ona yağmur endirdiyimiz zaman, ← Sən yer üzünü qupquru görərsən.

اهْتَزَّتْ وَرَبَتْ وَاَنْبَتَتْ مِنْ كُلِّ زَوْجٍ بَهِيجٍ ﴿٥﴾
və hər növ gözəl (meyvədən, bitkidən) bar gətirər. ← o, hərəkətə gəlib qabarar,

ذٰلِكَ بِاَنَّ اللّٰهَ هُوَ الْحَقُّ وَاَنَّهُ يُحْيِ الْمَوْتٰى وَاَنَّهُ عَلٰى كُلِّ شَيْءٍ قَد۪يرٌ ﴿٦﴾
O, ölüləri diriltdir və O, hər şeyə qadirdir! ← Bu ona görədir ki, Allah haqdır.

وَاَنَّ السَّاعَةَ اٰتِيَةٌ لَا رَيْبَ ف۪يهَا وَاَنَّ اللّٰهَ يَبْعَثُ مَنْ فِي الْقُبُورِ ﴿٧﴾
Və Allah qəbirlərdə olanları dirildəcəkdir! ← Və qiyamət gələcəkdir. Ona heç bir şəkk-şübhə yoxdur.

وَمِنَ النَّاسِ مَنْ يُجَادِلُ فِي اللّٰهِ بِغَيْرِ عِلْمٍ
heç bir şey bilmədən Allah barəsində mübahisə edər; ← İnsanlardan eləsi də var ki,

وَلَا هُدًى وَلَا كِتَابٍ مُن۪يرٍ ﴿٨﴾
həm də haqq yolu göstərən heç bir rəhbəri və nurani kitabı olmadan.

ثَانِيَ عِطْفِه۪ لِيُضِلَّ عَنْ سَب۪يلِ اللّٰهِ
(O,) boynunu (təkəbbürlə) əyərək (insanları) Allahın yolundan çıxarmaq məqsədilə (bunu edər).

لَهُ فِي الدُّنْيَا خِزْيٌ وَنُذ۪يقُهُ يَوْمَ الْقِيٰمَةِ عَذَابَ الْحَر۪يقِ ﴿٩﴾
Qiyamət günü isə ona yanğın əzabını daddıracağıq! ← Onun üçün dünyada rüsvayçılıq vardır.

ذٰلِكَ بِمَا قَدَّمَتْ يَدَاكَ وَاَنَّ اللّٰهَ لَيْسَ بِظَلَّامٍ لِلْعَب۪يدِ ﴿١٠﴾
Yoxsa Allah bəndələrinə zülm edən deyildir!" ← "Bu, öz əllərinlə etdiyin (günahlara) görədir.

وَمِنَ النَّاسِ مَنْ يَعْبُدُ اللّٰهَ عَلٰى حَرْفٍ فَاِنْ اَصَابَهُ خَيْرٌ اطْمَاَنَّ بِه۪
Əgər ona bir xeyir toxunsa arxayın olar. ← İnsanlardan eləsi də var ki, Allaha tərəddüd içində ibadət edər.

وَاِنْ اَصَابَتْهُ فِتْنَةٌ انْقَلَبَ عَلٰى وَجْهِه۪
çöhrəsi dəyişər. ← Əgər ona bir bəla üz versə,

خَسِرَ الدُّنْيَا وَالْاٰخِرَةَ ذٰلِكَ هُوَ الْخُسْرَانُ الْمُب۪ينُ ﴿١١﴾
Əsl açıq-aşkar ziyan budur! ← Dünyanı da əldən verər, axirəti də.

يَدْعُوا مِنْ دُونِ اللّٰهِ مَا لَا يَضُرُّهُ وَمَا لَا يَنْفَعُهُ ذٰلِكَ هُوَ الضَّلَالُ الْبَع۪يدُ ﴿١٢﴾
Əsl uzaq olan zəlalət budur! ← O, Allahı buraxıb özünə nə zərər, nə də xeyir verən bütlərə dua edər.

يَدْعُوا لَمَنْ ضَرُّهُ اَقْرَبُ مِنْ نَفْعِه۪ لَبِئْسَ الْمَوْلٰى وَلَبِئْسَ الْعَش۪يرُ ﴿١٣﴾
(O dua etdiyi) nə pis köməkçi və necə də pis yoldaşdır! ← O, zərəri xeyirindən daha çox olana dua edər.

اِنَّ اللّٰهَ يُدْخِلُ الَّذ۪ينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جَنَّاتٍ تَجْر۪ي مِنْ تَحْتِهَا الْاَنْهَارُ
onun altından çaylar axır.← Həqiqətən, Allah, iman gətirib yaxşı işlər görənləri cənnətlərə daxil edər ki,

اِنَّ اللّٰهَ يَفْعَلُ مَا يُر۪يدُ ﴿١٤﴾ مَنْ كَانَ يَظُنُّ اَنْ
Hər kim zənn edirsə ki, ← Şübhəsiz ki, Allah istədiyini edər.

لَنْ يَنْصُرَهُ اللّٰهُ فِي الدُّنْيَا وَالْاٰخِرَةِ فَلْيَمْدُدْ بِسَبَبٍ اِلَى السَّمَاۤءِ
qoy göyə bir ip uzatsın, ← Allah dünyada və axirətdə özünə kömək göstərməyəcək,

ثُمَّ لْيَقْطَعْ فَلْيَنْظُرْ هَلْ يُذْهِبَنَّ كَيْدُهُ مَا يَغ۪يظُ ﴿١٥﴾
onun hiyləsi, qəzəbinə səbəb olan şeyi aradan qaldırırmı? ← sonra kəssin və görsün ki,

وَكَذٰلِكَ اَنْزَلْنَاهُ اٰيَاتٍ بَيِّنَاتٍ وَاَنَّ اللّٰهَ يَهْدِي مَنْ يُرِيدُ ﴿١٦﴾

Və Allah dilədiyinə doğru yolu göstərər. ← Biz onu (Quranı) beləcə açıq-aşkar ayələr şəklində nazil etdik.

اِنَّ الَّذِينَ اٰمَنُوا وَالَّذِينَ هَادُوا وَالصَّابِئِينَ وَالنَّصَارٰى

Həqiqətən, iman gətirənlər (müsəlmanlar), yəhudilər, sabiilər (ulduzpərəstlər), xaçpərəstlər,

وَالْمَجُوسَ وَالَّذِينَ اَشْرَكُوا اِنَّ اللّٰهَ يَفْصِلُ بَيْنَهُمْ يَوْمَ الْقِيٰمَةِ

Allah, mütləq onların arasında qiyamət günü hökmünü verəcəkdir. ← atəşpərəstlər və müşriklər;

اِنَّ اللّٰهَ عَلٰى كُلِّ شَيْءٍ شَهِيدٌ ﴿١٧﴾

Şübhəsiz ki, Allah hər şeyə şahiddir!

اَلَمْ تَرَ اَنَّ اللّٰهَ يَسْجُدُ لَهُ مَنْ فِي السَّمٰوَاتِ وَمَنْ فِي الْاَرْضِ

...göylərdə və yerdə olanlar. ← Görmədinmi ki, Allaha səcdə edir...

وَالشَّمْسُ وَالْقَمَرُ وَالنُّجُومُ وَالْجِبَالُ وَالشَّجَرُ وَالدَّوَابُّ وَكَثِيرٌ مِنَ النَّاسِ

və insanların bir çoxu (Allaha səcdə edir).← Günəş, Ay, ulduzlar, dağlar, ağaclar, heyvanlar,

وَكَثِيرٌ حَقَّ عَلَيْهِ الْعَذَابُ وَمَنْ يُهِنِ اللّٰهُ فَمَا لَهُ مِنْ مُكْرِمٍ

Allahın alçaltdığı kimsəni heç kəs yüksəldə bilməz. ← Bir çoxuna da əzab vacib olmuşdur.

اِنَّ اللّٰهَ يَفْعَلُ مَا يَشَاءُ ﴿١٨﴾

Həqiqətən, Allah dilədiyini edər!

هٰذَانِ خَصْمَانِ اخْتَصَمُوا فِي رَبِّهِمْ فَالَّذِينَ كَفَرُوا قُطِّعَتْ لَهُمْ ثِيَابٌ مِنْ نَارٍ

Kafirlər üçün atəşdən paltarlar biçilmişdır. ← Rəbbi barəsində mübahisə edən bu ikisi düşməndir.

يُصَبُّ مِنْ فَوْقِ رُؤُسِهِمُ الْحَمِيمُ ﴿١٩﴾

Başlarının üstündən qaynar su töküləcəkdir.

يُصْهَرُ بِهِ مَا فِي بُطُونِهِمْ وَالْجُلُودُ ﴿٢٠﴾ وَلَهُمْ مَقَامِعُ مِنْ حَدِيدٍ ﴿٢١﴾

Onlar üçün dəmirdən qamçılar da vardır. ← Onunla, qarınlarında olanlar və dəriləri əridiləcəkdir.

كُلَّمَا اَرَادُوا اَنْ يَخْرُجُوا مِنْهَا مِنْ غَمٍّ اُعِيدُوا فِيهَا وَذُوقُوا عَذَابَ الْحَرِيقِ ﴿٢٢﴾

təkrar ora qaytarılarlar və:"Dadın atəşin əzabını!" (deyilər).← Oradan - qəmdən qurtarmaq istədikcə,

اِنَّ اللّٰهَ يُدْخِلُ الَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ جَنَّاتٍ تَجْرِي مِنْ تَحْتِهَا الْاَنْهَارُ

onun altından çaylar axır. ← Əlbəttə Allah, iman edib yaxşı işlər görənləri cənnətlərə daxil edəcəkdir ki,

يُحَلَّوْنَ فِيهَا مِنْ اَسَاوِرَ مِنْ ذَهَبٍ وَلُؤْلُؤًا وَلِبَاسُهُمْ فِيهَا حَرِيرٌ ﴿٢٣﴾

Orada onların paltarları da ipəkdəndir! ← Onlar orada qızıldan bilərziklərlə və incilərlə bəzənəcəklər.

وَهُدُوٓا اِلَى الطَّيِّبِ مِنَ الْقَوْلِ وَهُدُوٓا اِلٰى صِرَاطِ الْحَمِيدِ ﴿٢٤﴾

və həmd olunan (Allahın) yoluna yönəldilmişlər. ← Onlar təmiz sözə yönəldilmişlər,

اِنَّ الَّذِينَ كَفَرُوا وَيَصُدُّونَ عَنْ سَبِيلِ اللّٰهِ وَالْمَسْجِدِ الْحَرَامِ

...Allah yolundan və Məscidülhəramdan; ← Şübhəsiz, o kəslər ki, kafir olub (insanları) döndərərlər...

الَّذِي جَعَلْنَاهُ لِلنَّاسِ سَوَٓاءً الْعَاكِفُ فِيهِ وَالْبَادِّ

Hansı ki, onu, insanlardan həm yerli olanlar üçün, həm də gəlmələr üçün (qiblə, məbəd) etmişik.

وَمَنْ يُرِدْ فِيهِ بِاِلْحَادٍ بِظُلْمٍ نُذِقْهُ مِنْ عَذَابٍ اَلِيمٍ ﴿٢٥﴾

ona, şiddətli əzabdan daddıracağıq! ← Orada zülm edərək haqsızlığa meyl etmək istəyənə gəldikdə,

وَاِذْ بَوَّأْنَا لِاِبْرٰهِيمَ مَكَانَ الْبَيْتِ اَنْ لَا تُشْرِكْ بِي شَيْـًٔا

“Mənə heç bir şeyi şərik qoşma, ← Bir zaman İbrahim üçün, Evin (Kəbənin) yerini hazırlayıb (demişdik):

وَطَهِّرْ بَيْتِيَ لِلطَّٓائِفِينَ وَالْقَٓائِمِينَ وَالرُّكَّعِ السُّجُودِ ﴿٢٦﴾

...təvaf edənlər, namaza duranlar, rüku edən və səcdəyə qapananlar üçün!” ← və Mənim evimi təmizlə...

وَاَذِّنْ فِي النَّاسِ بِالْحَجِّ يَأْتُوكَ رِجَالًا

onlar sənin yanına (həm) piyada gəlsinlər, ← İnsanları həccə çağır ki,

وَعَلٰى كُلِّ ضَامِرٍ يَأْتِينَ مِنْ كُلِّ فَجٍّ عَمِيقٍ ﴿٢٧﴾

həm də dört bir yandan hər cür arıq (yorğun minik heyvanları) üstündə gəlsinlər.

لِيَشْهَدُوا مَنَافِعَ لَهُمْ وَيَذْكُرُوا اسْمَ اللّٰهِ فِيٓ اَيَّامٍ مَعْلُومَاتٍ

və məlum günlərdə (qurban kəsərkən) Allahın adını çəksinlər... ← (Və) öz mənfəətlərinin şahidi olsunlar,

عَلٰى مَا رَزَقَهُمْ مِنْ بَهِيمَةِ الْاَنْعَامِ فَكُلُوا مِنْهَا وَاَطْعِمُوا الْبَٓائِسَ الْفَقِيرَ ﴿٢٨﴾

Onlardan yeyin, biçarə yoxsullara da yedirdin! ← ...onlara ruzi verdiyi heyvanların üstündə.

ثُمَّ لْيَقْضُوا تَفَثَهُمْ وَلْيُوفُوا نُذُورَهُمْ وَلْيَطَّوَّفُوا بِالْبَيْتِ الْعَتِيقِ ﴿٢٩﴾

və Qədim Evi (Kəbəni) təvaf etsinlər! ← Sonra kirlərini təmizləsinlər, nəzirlərini versinlər,

ذٰلِكَ وَمَنْ يُعَظِّمْ حُرُمَاتِ اللّٰهِ فَهُوَ خَيْرٌ لَهُ عِنْدَ رَبِّهِ

bu, Rəbbi yanında onun üçün xeyirli olar. ← Budur. Kim Allahın haram etdiyinə hörmət etsə,

وَاُحِلَّتْ لَكُمُ الْاَنْعَامُ اِلَّا مَا يُتْلٰى عَلَيْكُمْ

Sizə deyilənlərin xaricindəki heyvanlar sizə halal edilmişdir.

فَاجْتَنِبُوا الرِّجْسَ مِنَ الْاَوْثَانِ وَاجْتَنِبُوا قَوْلَ الزُّورِ ﴿٣٠﴾

Yalan sözlərdən də çəkinin... ← Elə isə, murdar bütlərdən qaçın.

حُنَفَآءَ لِلّٰهِ غَيْرَ مُشْرِكِينَ بِهِ

... Allaha təslim olaraq, Ona şərik qoşmayaraq!

وَمَنْ يُشْرِكْ بِاللّٰهِ فَكَاَنَّمَا خَرَّ مِنَ السَّمَآءِ

sanki göydən düşüb, ← Allaha şərik qoşan kimsə,

فَتَخْطَفُهُ الطَّيْرُ اَوْ تَهْوِي بِهِ الرِّيحُ فِي مَكَانٍ سَحِيقٍ ﴿٣١﴾

yaxud küləyin sovurub uzaq bir yerə atdığı (bir şeyə bənzər). ← quşların onu sürətlə alıb apardığı,

ذٰلِكَ وَمَنْ يُعَظِّمْ شَعَآئِرَ اللّٰهِ فَاِنَّهَا مِنْ تَقْوَى الْقُلُوبِ ﴿٣٢﴾

bu, şübhəsiz ki, qəlblərin təqvasındandır. ← Budur. Kim Allahın nişanələrinə hörmət etsə,

لَكُمْ فِيهَا مَنَافِعُ اِلٰٓى اَجَلٍ مُسَمًّى ثُمَّ مَحِلُّهَآ اِلَى الْبَيْتِ الْعَتِيقِ ﴿٣٣﴾

Sonra onların kəsiləcəyi yer qədim ev tərəfədir. ← Sizin üçün onlarda müəyyən bir vaxta qədər mənfəət vardır.

وَلِكُلِّ اُمَّةٍ جَعَلْنَا مَنْسَكًا لِيَذْكُرُوا اسْمَ اللّٰهِ

(qurban kəsərkən) Allahın adını çəksinlər... ← Biz hər bir ümmət üçün qurbangah müəyyən etdik ki,

عَلٰى مَا رَزَقَهُمْ مِنْ بَهِيمَةِ الْاَنْعَامِ فَاِلٰهُكُمْ اِلٰهٌ وَاحِدٌ

Sizin tanrınız bir olan tanrıdır (Allahdır). ← ...(Allahın) onlara ruzi verdiyi heyvanların üstündə.

فَلَهُ اَسْلِمُوا وَبَشِّرِ الْمُخْبِتِينَ ﴿٣٤﴾

(Ey Rəsulum!) təvazökar insanlara da müjdə ver; ← Elə isə, Ona təslim olun!

اَلَّذِينَ اِذَا ذُكِرَ اللّٰهُ وَجِلَتْ قُلُوبُهُمْ وَالصَّابِرِينَ عَلٰى مَآ اَصَابَهُمْ

və özlərinin başına gələn müsibətlərə səbr edərlər,← O kəslərə ki, Allahın adı çəkildiyi zaman qəlbləri titrəyər,

وَالْمُقِيمِي الصَّلٰوةِ وَمِمَّا رَزَقْنَاهُمْ يُنْفِقُونَ ﴿٣٥﴾

namazı qılarlar və onlara verdiyimiz ruzidən (ehtiyacı olanlara) sərf edərlər.

وَالْبُدْنَ جَعَلْنَاهَا لَكُمْ مِنْ شَعَآئِرِ اللّٰهِ لَكُمْ فِيهَا خَيْرٌ

Sizin üçün onlarda xeyir vardır. ← Qurbanlıq dəvələri də sizin üçün Allahın nişanələrindən etdik.

فَاذْكُرُوا اسْمَ اللّٰهِ عَلَيْهَا صَوَآفَّ فَاِذَا وَجَبَتْ جُنُوبُهَا

Böyrü üstə düşdükdə, ← Onları (kəsərkən) ayaqda durduqları halda üzərində Allahın adını çəkin.

فَكُلُوا مِنْهَا وَاَطْعِمُوا الْقَانِعَ وَالْمُعْتَرَّ

ondan (ətindən) yeyin, əl açmayana və dilənçiyə də yedirdin.

كَذٰلِكَ سَخَّرْنَاهَا لَكُمْ لَعَلَّكُمْ تَشْكُرُونَ ﴿٣٦﴾

bəlkə, siz şükr edəsiniz! ← Beləcə onları (o heyvanları) sizə ram etdik ki,

لَنْ يَنَالَ اللّٰهَ لُحُومُهَا وَلَا دِمَآؤُهَا وَلٰكِنْ يَنَالُهُ التَّقْوٰى مِنْكُمْ

Sizdən Ona çatacaq olan yalnız təqvanızdır. ← Onların nə əti, nə də qanı Allaha çatmaz.

كَذٰلِكَ سَخَّرَهَا لَكُمْ لِتُكَبِّرُوا اللّٰهَ عَلٰى مَا هَدٰيكُمْ وَبَشِّرِ الْمُحْسِنِينَ ﴿٣٧﴾

Gözəl iş görənlərə müjdə ver!← sizi doğru yola yönəltdiyi üçün Allahı uca tutasınız.← Beləcə onları sizə ram etdi ki,

اِنَّ اللّٰهَ يُدَافِعُ عَنِ الَّذِينَ اٰمَنُوا اِنَّ اللّٰهَ لَا يُحِبُّ كُلَّ خَوَّانٍ كَفُورٍ ﴿٣٨﴾

Allah, həqiqətən, heç bir nankor xaini sevməz! ← Şübhəsiz ki, Allah iman gətirənləri qoruyar.

اُذِنَ لِلَّذِينَ يُقَاتَلُونَ بِاَنَّهُمْ ظُلِمُواۜ وَاِنَّ اللّٰهَ عَلٰى نَصْرِهِمْ لَقَدِيرٌۙ ﴿٣٩﴾
Allah onlara kömək etməyə əlbəttə, qadirdir! ← Zülmə məruz qaldıqlarına görə vuruşanlara izin verilmişdir.

اَلَّذِينَ اُخْرِجُوا مِنْ دِيَارِهِمْ بِغَيْرِ حَقٍّ اِلَّٓا اَنْ يَقُولُوا رَبُّنَا اللّٰهُ
sadəcə "Rəbbimiz Allahdır"- dediklərinə görə (çıxarıldılar). ← Haqsız yerə, yurdlarından çıxarılanlar,

وَلَوْلَا دَفْعُ اللّٰهِ النَّاسَ بَعْضَهُمْ بِبَعْضٍ
Əgər Allah insanların bir qismini digər qismi ilə dəf etməsəydi,

لَهُدِّمَتْ صَوَامِعُ وَبِيَعٌ وَصَلَوَاتٌ وَمَسَاجِدُ يُذْكَرُ فِيهَا اسْمُ اللّٰهِ كَثِيرًاۜ
oralarda Allahın adı çox çəkilir. ← monastırlar, kilsələr, sinaqoqlar və məscidlər əlbəttə, dağılıb gedərdi ki,

وَلَيَنْصُرَنَّ اللّٰهُ مَنْ يَنْصُرُهُۜ اِنَّ اللّٰهَ لَقَوِيٌّ عَزِيزٌ ﴿٤٠﴾
Həqiqətən, Allah yenilməz qüvvət, qüdrət sahibidir!←Allah, Öz (dininə) yardım edənə, şübhəsiz, yardım edər.

اَلَّذِينَ اِنْ مَكَّنَّاهُمْ فِي الْاَرْضِ اَقَامُوا الصَّلٰوةَ وَاٰتَوُا الزَّكٰوةَ
namazı qılarlar, zəkatı verərlər, ← (Onlar) o kəslərdir ki, əgər onları yer üzündə yerləşdirsək,

وَاَمَرُوا بِالْمَعْرُوفِ وَنَهَوْا عَنِ الْمُنْكَرِۜ وَلِلّٰهِ عَاقِبَةُ الْاُمُورِ ﴿٤١﴾
İşlərin sonu isə Allaha aiddir. ← yaxşı işlər görməyi əmr edib, pis işlər görməyi qadağan edərlər.

وَاِنْ يُكَذِّبُوكَ فَقَدْ كَذَّبَتْ قَبْلَهُمْ قَوْمُ نُوحٍ وَعَادٌ وَثَمُودُۙ ﴿٤٢﴾
Onlardan əvvəl Nuh, Ad və Səmud tayfası da təkzib etmişdi.← Əgər səni təkzib edərlərsə (ürəyini qısma).

وَقَوْمُ اِبْرٰهِيمَ وَقَوْمُ لُوطٍۙ ﴿٤٣﴾
İbrahim tayfası da, Lut qövmü də (peyğəmbərlərini təkzib etmişdi).

وَاَصْحَابُ مَدْيَنَۚ وَكُذِّبَ مُوسٰى
Musa da yalançı sayılmışdı. ← Mədyən əhli də (peyğəmbərlərini təkzib etmişdi).

فَاَمْلَيْتُ لِلْكَافِرِينَ ثُمَّ اَخَذْتُهُمْۚ فَكَيْفَ كَانَ نَكِيرِ ﴿٤٤﴾
Bəs mənim inkar etməyim (cəzalandırmağım) necə oldu! ← Kafirlərə möhlət verdim, sonra onları yaxaladım.

فَكَاَيِّنْ مِنْ قَرْيَةٍ اَهْلَكْنَاهَا وَهِيَ ظَالِمَةٌ فَهِيَ خَاوِيَةٌ عَلٰى عُرُوشِهَا
ora viranə qalmışdı. ← Zalım olduqları halda məhv etdiyimiz neçə-neçə məmləkət var ki,

وَبِئْرٍ مُعَطَّلَةٍ وَقَصْرٍ مَشِيدٍ ﴿٤٥﴾
(Neçə-neçə) xarab olmuş su quyuları və möhtəşəm qəsrlər də (bomboş qalmışdı).

اَفَلَمْ يَسِيرُوا فِي الْاَرْضِ فَتَكُونَ لَهُمْ قُلُوبٌ يَعْقِلُونَ بِهَٓا
beləcə, düşünən qəlbləri olsun, ← Onlar yer üzündə gəzib dolaşmadılarmı ki,

اَوْ اٰذَانٌ يَسْمَعُونَ بِهَاۚ فَاِنَّهَا لَا تَعْمَى الْاَبْصَارُ
Həqiqətən, gözlər kor olmaz. ← yaxud eşidən qulaqları (olsun)?

وَلٰكِنْ تَعْمَى الْقُلُوبُ الَّتِي فِي الصُّدُورِ ﴿٤٦﴾
Lakin sinələrdəki ürəklər kor olar.

وَيَسْتَعْجِلُونَكَ بِالْعَذَابِ وَلَنْ يُخْلِفَ اللّٰهُ وَعْدَهُ

Allah Öz vədinə əsla xilaf çıxmaz! ← (Ey Rəsulum!) Əzabın gəlməsi üçün səni tələsdirirlər.

وَاِنَّ يَوْمًا عِنْدَ رَبِّكَ كَاَلْفِ سَنَةٍ مِمَّا تَعُدُّونَ ﴿٤٧﴾

sizin saydığınızın (hesabladığınız) min il kimidir! ← Şübhəsiz, Rəbbinin dərgahındakı bir gün,

وَكَاَيِّنْ مِنْ قَرْيَةٍ اَمْلَيْتُ لَهَا وَهِيَ ظَالِمَةٌ ثُمَّ اَخَذْتُهَاۚ وَاِلَيَّ الْمَصِيرُ ﴿٤٨﴾

sonra onları yaxaladım. Axır dönüş Mənədir! ← Neçə-neçə məmləkətə, zülm etdikləri halda möhlət verdim,

قُلْ يَٓا اَيُّهَا النَّاسُ اِنَّمَٓا اَنَا لَكُمْ نَذِيرٌ مُبِينٌ ﴿٤٩﴾

Mən yalnızca sizi açıq-aşkar xəbərdar edənəm! ← De ki: “Ey insanlar!

فَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ لَهُمْ مَغْفِرَةٌ وَرِزْقٌ كَرِيمٌ ﴿٥٠﴾

onlar üçün bağışlanma və bol ruzi vardır! ← İman gətirib yaxşı işlər görənlərə gəlincə,

وَالَّذِينَ سَعَوْا فِيٓ اٰيَاتِنَا مُعَاجِزِينَ اُو۬لٰٓئِكَ اَصْحَابُ الْجَحِيمِ ﴿٥١﴾

onlar cəhənnəm əhlidirlər! ← Ayələrimizi aciz qoymaq üçün səy göstərənlərə gəldikdə isə,

وَمَٓا اَرْسَلْنَا مِنْ قَبْلِكَ مِنْ رَسُولٍ وَلَا نَبِيٍّ

(Ey Rəsulum!) Biz səndən əvvəl elə bir rəsul və elə bir nəbi göndərmədik ki,

اِلَّا اِذَا تَمَنّٰٓى اَلْقَى الشَّيْطَانُ فِيٓ اُمْنِيَّتِهِۚ فَيَنْسَخُ اللّٰهُ مَا يُلْقِي الشَّيْطَانُ

Allah isə Şeytanın atdığını yox edər. ← o təmənna etdikdə Şeytan onun arzusuna (bir fikir) atmasın!

ثُمَّ يُحْكِمُ اللّٰهُ اٰيَاتِهِۜ وَاللّٰهُ عَلِيمٌ حَكِيمٌ ﴿٥٢﴾

Allah (hər şeyi) biləndir, hikmət sahibidir! ← Sonra Allah Öz ayələrini möhkəmlədər.

لِيَجْعَلَ مَا يُلْقِي الشَّيْطَانُ فِتْنَةً لِلَّذِينَ فِي قُلُوبِهِمْ مَرَضٌ

...qəlblərində xəstəlik olanlar üçün, ← (Allah bunu belə edir ki), Şeytanın vəsvəsəsini bir sınaq vasitəsi etsin...

وَالْقَاسِيَةِ قُلُوبُهُمْ وَاِنَّ الظَّالِمِينَ لَفِي شِقَاقٍ بَعِيدٍ ﴿٥٣﴾

Şübhəsiz ki, zalımlar uzaq bir ayrılıq içindədirlər. ← və ürəkləri qatı olanlar üçün!

وَلِيَعْلَمَ الَّذِينَ اُو۫تُوا الْعِلْمَ اَنَّهُ الْحَقُّ مِنْ رَبِّكَ

haqq (Quran) sənin Rəbbindəndir. ← Elm verilən kəslər də bilsinlər ki,

فَيُؤْمِنُوا بِهِ فَتُخْبِتَ لَهُ قُلُوبُهُمْ وَاِنَّ اللّٰهَ لَهَادِ الَّذِينَ اٰمَنُوٓا اِلٰى صِرَاطٍ مُسْتَقِيمٍ ﴿٥٤﴾

Şübhəsiz, Allah iman gətirənləri doğru yola yönəldər!← Ona inansınlar və ürəkləri ondan arxayın olsun.

وَلَا يَزَالُ الَّذِينَ كَفَرُوا فِي مِرْيَةٍ مِنْهُ حَتّٰى تَاْتِيَهُمُ السَّاعَةُ بَغْتَةً

qiyamət qəflətən onlara gəlib çatana qədər, ← Kafirlər isə ondan şəkk-şübhədə olmaqda davam edəcəklər,

اَوْ يَاْتِيَهُمْ عَذَابُ يَوْمٍ عَقِيمٍ ﴿٥٥﴾

yaxud o xeyirsiz günün əzabı onlara gəlib yetişənədək.

اَلْمُلْكُ يَوْمَئِذٍ لِلّٰهِ يَحْكُمُ بَيْنَهُمْ
(Allah) onların arasında hökm edəcəkdir. ← O gün (qiyamət günü) hökmranlıq Allahındır.

فَالَّذِينَ اٰمَنُوا وَعَمِلُوا الصَّالِحَاتِ فِي جَنَّاتِ النَّعِيمِ ﴿٥٦﴾
Nəim cənnətlərində olacaqlar! ← Beləcə, iman gətirib yaxşı işlər görənlər,

وَالَّذِينَ كَفَرُوا وَكَذَّبُوا بِاٰيَاتِنَا فَاُو۬لٰٓئِكَ لَهُمْ عَذَابٌ مُهِينٌ ﴿٥٧﴾
onlar üçün rüsvayedici bir əzab vardır! ← Kafir olub ayələrimizi yalan hesab edənlərə gəlincə,

وَالَّذِينَ هَاجَرُوا فِي سَبِيلِ اللّٰهِ ثُمَّ قُتِلُوٓا اَوْ مَاتُوا
sonra öldürülərlər, yaxud ölərlər; ← O kəslər ki, Allah yolunda hicrət edərlər,

لَيَرْزُقَنَّهُمُ اللّٰهُ رِزْقًا حَسَنًا وَاِنَّ اللّٰهَ لَهُوَ خَيْرُ الرَّازِقِينَ ﴿٥٨﴾
Şübhəsiz ki, Allah ruzi verənlərin ən yaxşısıdır! ← Allah onlara həqiqətən, gözəl ruzi verəcəkdir.

لَيُدْخِلَنَّهُمْ مُدْخَلًا يَرْضَوْنَهُ وَاِنَّ اللّٰهَ لَعَلِيمٌ حَلِيمٌ ﴿٥٩﴾
Həqiqətən, Allah (hər şeyi) biləndir, həlimdir! ← (Allah) onları, razı qalacaqları bir yerə daxil edəcəkdir.

ذٰلِكَ وَمَنْ عَاقَبَ بِمِثْلِ مَا عُوقِبَ بِهِ ثُمَّ بُغِيَ عَلَيْهِ
sonra təcavüzə məruz qalsa, ← Budur. Kim, özünə verilən cəza kimi cəza verib,

لَيَنْصُرَنَّهُ اللّٰهُ اِنَّ اللّٰهَ لَعَفُوٌّ غَفُورٌ ﴿٦٠﴾
Həqiqətən, Allah əfv edəndir, bağışlayandır! ← şübhəsiz ki, Allah ona kömək edər.

ذٰلِكَ بِاَنَّ اللّٰهَ يُولِجُ الَّيْلَ فِي النَّهَارِ وَيُولِجُ النَّهَارَ فِي الَّيْلِ
günzdüzü də gecəyə qatar. ← Bu ona görədir ki, Allah gecəni gündüzə qatar,

وَاَنَّ اللّٰهَ سَمِيعٌ بَصِيرٌ ﴿٦١﴾
Və ona görə ki, Allah (hər şeyi) eşidəndir, görəndir!

ذٰلِكَ بِاَنَّ اللّٰهَ هُوَ الْحَقُّ وَاَنَّ مَا يَدْعُونَ مِنْ دُونِهِ هُوَ الْبَاطِلُ
Ondan başqa dua etdikləri (bütlər, tanrılar) isə batildir. ← Bu ona görədir ki, Allah haqqdır.

وَاَنَّ اللّٰهَ هُوَ الْعَلِيُّ الْكَبِيرُ ﴿٦٢﴾ اَلَمْ تَرَ اَنَّ اللّٰهَ اَنْزَلَ مِنَ السَّمَاءِ مَاءً
Görmədinmi ki, Allah göydən su endirdi, ← Həqiqətən, Allah ucadır, böyükdür!

فَتُصْبِحُ الْاَرْضُ مُخْضَرَّةً اِنَّ اللّٰهَ لَطِيفٌ خَبِيرٌ ﴿٦٣﴾
Həqiqətən, Allah lütfkardır, (hər işdən) xəbərdardır. ← və yer üzü (onunla) yamyaşıl olur?

لَهُ مَا فِي السَّمٰوَاتِ وَمَا فِي الْاَرْضِ وَاِنَّ اللّٰهَ لَهُوَ الْغَنِيُّ الْحَمِيدُ ﴿٦٤﴾
Həqiqətən, Allah ehtiyacsızdır, şükürə layiqdir! ← Göylərdə və yerdə nə varsa Onundur.

اَلَمْ تَرَ اَنَّ اللّٰهَ سَخَّرَ لَكُمْ مَا فِي الْاَرْضِ وَالْفُلْكَ تَجْر۪ي فِي الْبَحْرِ بِاَمْرِه۪ۜ
Yerdə olanları və dənizdə Onun əmrilə üzən gəmiləri? ← Görmədinmi ki, Allah sizə ram etmişdir;

وَيُمْسِكُ السَّمَٓاءَ اَنْ تَقَعَ عَلَى الْاَرْضِ اِلَّا بِاِذْنِه۪ۜ اِنَّ اللّٰهَ بِالنَّاسِ لَرَؤُ۫فٌ رَح۪يمٌ ﴿٦٥﴾
Şübhəsiz, Allah insanlara şəfqətli, mərhəmətlidir! ← Ondan izinsiz yerin üzərinə düşməməsi üçün göyü tutur.

وَهُوَ الَّذ۪ٓي اَحْيَاكُمْ ثُمَّ يُم۪يتُكُمْ ثُمَّ يُحْي۪يكُمْ اِنَّ الْاِنْسَانَ لَكَفُورٌ ﴿٦٦﴾
sonra sizi dirildəcək. Həqiqətən insan çox nankordur. ← Sizi dirildən Odur. Sonra sizi öldürəcək,

لِكُلِّ اُمَّةٍ جَعَلْنَا مَنْسَكاً هُمْ نَاسِكُوهُ
onlar ona əməl edərlər. ← Biz hər ümmət üçün bir şəriət müəyyən etdik ki,

فَلَا يُنَازِعُنَّكَ فِي الْاَمْرِ وَادْعُ اِلٰى رَبِّكَ
Sən (onları) öz Rəbbinə dəvət et. ← Elə isə, (bu) işdə səninlə mübahisə etməsinlər.

اِنَّكَ لَعَلٰى هُدًى مُسْتَق۪يمٍ ﴿٦٧﴾
Şübhəsiz ki, sən doğru yol üzərindəsən.

وَاِنْ جَادَلُوكَ فَقُلِ اللّٰهُ اَعْلَمُ بِمَا تَعْمَلُونَ ﴿٦٨﴾
“Allah sizin nə etdiyinizi daha yaxşı bilir. ← (Ey Rəsulum!) Əgər səninlə mübahisə etsələr, de ki:

اَللّٰهُ يَحْكُمُ بَيْنَكُمْ يَوْمَ الْقِيٰمَةِ ف۪يمَا كُنْتُمْ ف۪يهِ تَخْتَلِفُونَ ﴿٦٩﴾
...ixtilafda olduğunuz məsələlər barəsində!” ← Allah, qiyamət günü aranızda hökm verəcəkdir...

اَلَمْ تَعْلَمْ اَنَّ اللّٰهَ يَعْلَمُ مَا فِي السَّمَٓاءِ وَالْاَرْضِۜ
Allah, göydə və yerdə nə varsa (hamısını) bilir? ← Bilmədinmi ki,

اِنَّ ذٰلِكَ ف۪ي كِتَابٍۜ اِنَّ ذٰلِكَ عَلَى اللّٰهِ يَس۪يرٌ ﴿٧٠﴾
Şübhəsiz ki, , Allah üçün bu asandır! ← Həqiqətən, bu, (lövhi-məhfuzda) bir kitabdadır.

وَيَعْبُدُونَ مِنْ دُونِ اللّٰهِ مَا لَمْ يُنَزِّلْ بِه۪ سُلْطَاناً
(Allah), onlar haqqında heç bir dəlil nazil etməmişdir, ← Onlar, Allahı qoyub elə bir şeyə ibadət edirlər (ki),

وَمَا لَيْسَ لَهُمْ بِه۪ عِلْمٌ وَمَا لِلظَّالِم۪ينَ مِنْ نَص۪يرٍ ﴿٧١﴾
Zalımlara heç bir yardım edən olmaz! ← və ona dair onların heç bir bilikləri də yoxdur.

وَاِذَا تُتْلٰى عَلَيْهِمْ اٰيَاتُنَا بَيِّنَاتٍ تَعْرِفُ ف۪ي وُجُوهِ الَّذ۪ينَ كَفَرُوا الْمُنْكَرَ
kafir olanların üzlərində bir ikrah sezərsən. ← Ayələrimiz onlara açıq-aşkar surətdə oxunduğu zaman,

يَكَادُونَ يَسْطُونَ بِالَّذ۪ينَ يَتْلُونَ عَلَيْهِمْ اٰيَاتِنَاۜ قُلْ اَفَاُنَبِّئُكُمْ بِشَرٍّ مِنْ ذٰلِكُمْ
De: “Sizə bundan daha pisini xəbər verimmi? ← Özlərinə ayələrimizi oxuyanlara az qala hücum çəksinlər.

اَلنَّارُ وَعَدَهَا اللّٰهُ الَّذ۪ينَ كَفَرُواۜ وَبِئْسَ الْمَص۪يرُ ﴿٧٢﴾
Və o nə pis qayıdış yeridir!” ← Atəş! Allah onu kafirlərə vəd etmişdir.

يَٓا اَيُّهَا النَّاسُ ضُرِبَ مَثَلٌ فَاسْتَمِعُوا لَهُ اِنَّ الَّذٖينَ تَدْعُونَ مِنْ دُونِ اللّٰهِ

Şübhəsiz ki, Allahdan qeyri dua etdiyiniz şeylər, ← Ey insanlar! Bir məsəl çəkildi, ona qulaq asın!

لَنْ يَخْلُقُوا ذُبَابًا وَلَوِ اجْتَمَعُوا لَهُ

hamısı onun üçün bir yerə yığışsa belə! ← bir milçək də yarada bilməzlər,

وَاِنْ يَسْلُبْهُمُ الذُّبَابُ شَيْـًٔا لَا يَسْتَنْقِذُوهُ مِنْهُ

onu o (milçək)dən geri ala bilməzlər. ← Əgər milçək onlardan bir şey götürsə,

ضَعُفَ الطَّالِبُ وَالْمَطْلُوبُ ﴿٧٣﴾

İstəyən də aciz qaldı, istənilən də!

مَا قَدَرُوا اللّٰهَ حَقَّ قَدْرِهٖ اِنَّ اللّٰهَ لَقَوِيٌّ عَزٖيزٌ ﴿٧٤﴾

Həqiqətən, Allah yenilməz qüvvət sahibi, qüdrət sahibidir! ← Onlar Allahı layiqincə qiymətləndirmədilər.

اَللّٰهُ يَصْطَفٖي مِنَ الْمَلٰٓئِكَةِ رُسُلًا وَمِنَ النَّاسِ اِنَّ اللّٰهَ سَمٖيعٌ بَصٖيرٌ ﴿٧٥﴾

Həqiqətən, Allah (hər şeyi) eşidəndir, görəndir! ← Allah, mələklərdən və insanlardan elçilər seçər.

يَعْلَمُ مَا بَيْنَ اَيْدٖيهِمْ وَمَا خَلْفَهُمْ وَاِلَى اللّٰهِ تُرْجَعُ الْاُمُورُ ﴿٧٦﴾

Və (bütün) işlər Allaha qayıdar! ← (Allah) onların önlərindəkini də, arxalarındakını da bilir.

يَٓا اَيُّهَا الَّذٖينَ اٰمَنُوا ارْكَعُوا وَاسْجُدُوا وَاعْبُدُوا رَبَّكُمْ

Rəbbinizə ibadət edin, ← Ey iman gətirənlər! (Namaz qıldıqda) rüku edin, səcdəyə qapanın;

وَافْعَلُوا الْخَيْرَ لَعَلَّكُمْ تُفْلِحُونَ ﴿٧٧﴾

və yaxşı işlər görün ki, nicat tapasınız!

وَجَاهِدُوا فِي اللّٰهِ حَقَّ جِهَادِهٖ هُوَ اجْتَبٰيكُمْ

Allah yolunda layiqincə cihad edin. O sizi seçdi.

وَمَا جَعَلَ عَلَيْكُمْ فِي الدّٖينِ مِنْ حَرَجٍ مِلَّةَ اَبٖيكُمْ اِبْرٰهٖيمَ

Atanız İbrahimin dinində (olduğu kimi). ← Və dində sizin üçün heç bir çətinlik vermədi;

هُوَ سَمّٰيكُمُ الْمُسْلِمٖينَ مِنْ قَبْلُ وَفٖي هٰذَا لِيَكُونَ الرَّسُولُ شَهٖيدًا عَلَيْكُمْ

Peyğəmbər sizə şahid olsun, ← O daha əvvəl də, bu (Quran)da da sizə müsəlman adını verdi ki,

وَتَكُونُوا شُهَدَٓاءَ عَلَى النَّاسِ فَاَقٖيمُوا الصَّلٰوةَ وَاٰتُوا الزَّكٰوةَ

Elə isə, namazı qılın, zəkatı verin, ← siz də insanlara şahid olasınız.

وَاعْتَصِمُوا بِاللّٰهِ هُوَ مَوْلٰيكُمْ فَنِعْمَ الْمَوْلٰى وَنِعْمَ النَّصٖيرُ ﴿٧٨﴾

(O), nə yaxşı ixtiyar sahibi və nə gözəl yardımçıdır! ← və Allaha sığının. O, sizin ixtiyar sahibinizdir.

﴿٢٣﴾ سُورَةُ الْمُؤْمِنُونَ

**əl-Mu’minun (Möminlər) surəsi**

**(Məkkədə nazil olmuşdur, 118 ayədir)**

بِسْمِ اللّٰهِ الرَّحْمَنِ الرَّحِيمِ

قَدْ اَفْلَحَ الْمُؤْمِنُونَ ﴿١﴾ اَلَّذِينَ هُمْ فِي صَلَاتِهِمْ خَاشِعُونَ ﴿٢﴾

O kəslər ki, onlar namazlarında itaətkardırlar; ← Möminlər nicat tapmışlar;

وَالَّذِينَ هُمْ عَنِ اللَّغْوِ مُعْرِضُونَ ﴿٣﴾ وَالَّذِينَ هُمْ لِلزَّكٰوةِ فَاعِلُونَ ﴿٤﴾

O kəslər ki, onlar zəkatı verərlər; ← O kəslər ki, onlar lağlağadan üz döndərərlər;

وَالَّذِينَ هُمْ لِفُرُوجِهِمْ حَافِظُونَ ﴿٥﴾

O kəslər ki, onlar ayıb yerlərini (zinadan) qoruyarlar!

اِلَّا عَلٰى اَزْوَاجِهِمْ اَوْ مَا مَلَكَتْ اَيْمَانُهُمْ فَاِنَّهُمْ غَيْرُ مَلُومِينَ ﴿٦﴾

Buna görə onlar qınanmazlar. ← Ancaq zövcələri və ya sahib olduqları (cariyələri bundan) istisnadır.

فَمَنِ ابْتَغٰى وَرَآءَ ذٰلِكَ فَاُولٰٓئِكَ هُمُ الْعَادُونَ ﴿٧﴾

onlar əsl həddi aşanlardır. ← Kim ondan artığını istəyərsə,

وَالَّذِينَ هُمْ لِاَمَانَاتِهِمْ وَعَهْدِهِمْ رَاعُونَ ﴿٨﴾ وَالَّذِينَ هُمْ عَلٰى صَلَوَاتِهِمْ يُحَافِظُونَ ﴿٩﴾

və o kəslər ki, onlar namazlarına davam edərlər; ← O kəslər ki, onlar əmanətlərinə və əhdlərinə riayət edərlər,

اُولٰٓئِكَ هُمُ الْوَارِثُونَ ﴿١٠﴾ اَلَّذِينَ يَرِثُونَ الْفِرْدَوْسَ هُمْ فِيهَا خَالِدُونَ ﴿١١﴾

Firdovs (cənnətinə) varis olanlardır. Onlar orada əbədi qalacaqlar! ← onlar əsl varislərdir;

وَلَقَدْ خَلَقْنَا الْاِنْسَانَ مِنْ سُلَالَةٍ مِنْ طِينٍ ﴿١٢﴾ ثُمَّ جَعَلْنَاهُ نُطْفَةً فِي قَرَارٍ مَكِينٍ ﴿١٣﴾

Sonra onu möhkəm bir yerdə nütfəyə çevirdik. ← Həqiqətən, insanı, süzülmüş palçıqdan yaratdıq.

ثُمَّ خَلَقْنَا النُّطْفَةَ عَلَقَةً فَخَلَقْنَا الْعَلَقَةَ مُضْغَةً

sonra laxtalanmış qanı bir parça ət etdik. ← Sonra nütfəni laxtalanmış qana (rüşeymə) çevirdik,

فَخَلَقْنَا الْمُضْغَةَ عِظَامًا فَكَسَوْنَا الْعِظَامَ لَحْمًا

sonra sümükləri ətlə örtdük. ← Sonra o əti sümüklərə döndərdik,

ثُمَّ اَنْشَاْنَاهُ خَلْقًا اٰخَرَ فَتَبَارَكَ اللّٰهُ اَحْسَنُ الْخَالِقِينَ ﴿١٤﴾

Yaradanların ən gözəli olan Allah nə qədər uludur! ← Sonra onu başqa bir məxluqat formasına saldıq.

ثُمَّ اِنَّكُمْ بَعْدَ ذٰلِكَ لَمَيِّتُونَ ﴿١٥﴾ ثُمَّ اِنَّكُمْ يَوْمَ الْقِيٰمَةِ تُبْعَثُونَ ﴿١٦﴾

Sonra siz qiyamət günü dirildiləcəksiniz! ← Sonra onun arxasınca siz mütləq öləcəksiniz!

وَلَقَدْ خَلَقْنَا فَوْقَكُمْ سَبْعَ طَرَآئِقَ وَمَا كُنَّا عَنِ الْخَلْقِ غَافِلِينَ ﴿١٧﴾

Biz yaratmaqdan qafil deyilik. ← Andolsun ki, Biz sizin üstünüzdə yeddi yol (təbəqə) yaratdıq.

وَاَنْزَلْنَا مِنَ السَّمَآءِ مَآءً بِقَدَرٍ فَاَسْكَنَّاهُ فِي الْاَرْضِ
Göydən lazım olan miqdarda su endirdik, → və onu yer üzündə saxladıq.

وَاِنَّا عَلٰى ذَهَابٍ بِهِ لَقَادِرُونَ ﴿١٨﴾
Əlbəttə, Biz onu aparmağa (buxarlaşdırmağa) da qadirik!

فَاَنْشَاْنَا لَكُمْ بِهِ جَنَّاتٍ مِنْ نَخِيلٍ وَاَعْنَابٍ لَكُمْ فِيهَا فَوَاكِهُ كَثِيرَةٌ وَمِنْهَا تَاْكُلُونَ ﴿١٩﴾
Və onunla, sizin üçün xurma və üzüm bağları yaratdıq. → Sizin üçün orada bir çox meyvələr var ki, onlardan yeyirsiniz.

وَشَجَرَةً تَخْرُجُ مِنْ طُورِ سَيْنَآءَ تَنْبُتُ بِالدُّهْنِ وَصِبْغٍ لِلْاٰكِلِينَ ﴿٢٠﴾
Sina dağından çıxan bir ağac da (yaratdıq ki), → o, yeyənlər üçün salat (zeytun) və yağ bitirər.

وَاِنَّ لَكُمْ فِي الْاَنْعَامِ لَعِبْرَةً نُسْقِيكُمْ مِمَّا فِي بُطُونِهَا
Həqiqətən, heyvanlarda da sizin üçün bir ibrət vardır. → Onların qarınlarında olan (süd)dən sizə içirdirik.

وَلَكُمْ فِيهَا مَنَافِعُ كَثِيرَةٌ وَمِنْهَا تَاْكُلُونَ ﴿٢١﴾
Onlarda sizin üçün daha bir çox mənfəətlər də vardır. → Həmçinin onlardan yeyirsiniz!

وَعَلَيْهَا وَعَلَى الْفُلْكِ تُحْمَلُونَ ﴿٢٢﴾
Həm onların (heyvanların) üstündə, həm də gəmilərin üstündə daşınırsınız.

وَلَقَدْ اَرْسَلْنَا نُوحًا اِلٰى قَوْمِهِ فَقَالَ يَا قَوْمِ اعْبُدُوا اللّٰهَ
Həqiqətən, Biz Nuhu öz qövmünə göndərdik. → O demişdi: “Ey qövmüm! Allaha ibadət edin!

مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ اَفَلَا تَتَّقُونَ ﴿٢٣﴾
Ondan başqa sizin heç bir tanrınız yoxdur! → Elə isə, (Allahdan) qorxmursunuzmu?”

فَقَالَ الْمَلَؤُا الَّذِينَ كَفَرُوا مِنْ قَوْمِهِ مَا هٰذَا اِلَّا بَشَرٌ مِثْلُكُمْ
Qövmünün kafir başçıları isə (qövmlərinə) dedilər: → “Bu sadəcə sizin kimi bir insandır.

يُرِيدُ اَنْ يَتَفَضَّلَ عَلَيْكُمْ وَلَوْ شَآءَ اللّٰهُ لَاَنْزَلَ مَلٰئِكَةً
(Nuh) sizə böyüklük etmək istəyir. → Əgər Allah istəsəydi, mələklər göndərərdi.

مَا سَمِعْنَا بِهٰذَا فِي اٰبَآئِنَا الْاَوَّلِينَ ﴿٢٤﴾ اِنْ هُوَ اِلَّا رَجُلٌ بِهِ جِنَّةٌ
Biz, keçmiş atalarımızdan bunu eşitməmişik. → O, sadəcə, özündə dəlilik olan bir adamdır.

فَتَرَبَّصُوا بِهِ حَتّٰى حِينٍ ﴿٢٥﴾ قَالَ رَبِّ انْصُرْنِي بِمَا كَذَّبُونِ ﴿٢٦﴾
Bir müddətə qədər ona nəzarət edin!” → (Nuh) dedi:“Ey Rəbbim! Məni yalanlamalarına qarşı mənə kömək et!”

فَاَوْحَيْنَا اِلَيْهِ اَنِ اصْنَعِ الْفُلْكَ بِاَعْيُنِنَا وَوَحْيِنَا
Biz də ona vəhy etdik ki: → “Gözlərimiz önündə və vəhyimizlə gəmini düzəlt.

فَاِذَا جَآءَ اَمْرُنَا وَفَارَ التَّنُّورُ فَاسْلُكْ فِيهَا مِنْ كُلٍّ زَوْجَيْنِ اثْنَيْنِ
Əmrimiz gəldiyi və təndir qaynadığı zaman, → hər (heyvan)dan bir cütü ora mindir.

وَاَهْلَكَ اِلَّا مَنْ سَبَقَ عَلَيْهِ الْقَوْلُ مِنْهُمْ
İçlərindən, (ölümünə) əvvəlcədən söz (hökm) verilmiş kimsələr istisna olmaqla, ailəni də (gəmiyə mindir).

وَلَا تُخَاطِبْنِي فِي الَّذِينَ ظَلَمُوا اِنَّهُمْ مُغْرَقُونَ ﴿٢٧﴾
Zülm edənlərin (bağışlanmaları) barəsində isə, Mənə müraciət etmə! → Onlar mütləq boğulacaqlar.

فَاِذَا اسْتَوَيْتَ اَنْتَ وَمَنْ مَعَكَ عَلَى الْفُلْكِ فَقُلِ الْحَمْدُ لِلّٰهِ الَّذ۪ي نَجّٰينَا مِنَ الْقَوْمِ الظَّالِم۪ينَ ﴿٢٨﴾
“Bizi, zalım tayfadan qurtaran Allaha həmd olsun!”-de. ← Özünlə birlikdə olanlarla gəmiyə mindiyin vaxt:

وَقُلْ رَبِّ اَنْزِلْن۪ي مُنْزَلًا مُبَارَكًا وَاَنْتَ خَيْرُ الْمُنْزِل۪ينَ ﴿٢٩﴾
Axı, sən sığınacaq verənlərin ən xeyirlisisən!” ← Və de ki: “Ey Rəbbim! Məni mübarək bir yerə düşürt.

اِنَّ ف۪ي ذٰلِكَ لَاٰيَاتٍ وَاِنْ كُنَّا لَمُبْتَل۪ينَ ﴿٣٠﴾ ثُمَّ اَنْشَاْنَا مِنْ بَعْدِهِمْ قَرْنًا اٰخَر۪ينَ ﴿٣١﴾
Sonra onların arxasınca başqa bir nəsil yaratdıq.← Əlbəttə, bunda ibrətlər vardır. Həqiqətən, imtahana çəkirik!

فَاَرْسَلْنَا ف۪يهِمْ رَسُولًا مِنْهُمْ اَنِ اعْبُدُوا اللّٰهَ
“Allaha ibadət edin.← Onlara da, özlərindən bir peyğəmbər göndərdik ki:

مَا لَكُمْ مِنْ اِلٰهٍ غَيْرُهُ اَفَلَا تَتَّقُونَ ﴿٣٢﴾
Elə isə, (Allahdan) qorxmursunuzmu?” ← Sizin, ondan başqa heç bir tanrınız yoxdur.

وَقَالَ الْمَلَاُ مِنْ قَوْمِهِ الَّذ۪ينَ كَفَرُوا وَكَذَّبُوا بِلِقَٓاءِ الْاٰخِرَةِ
o (başçılar) ki, kafir olub axirətə qovuşacaqlarını yalanlayırdılar, ← Tayfasının başçıları dedi,

وَاَتْرَفْنَاهُمْ فِي الْحَيٰوةِ الدُّنْيَا مَا هٰذَٓا اِلَّا بَشَرٌ مِثْلُكُمْ
“Bu sadəcə sizin kimi bir insandır; ← özlərinə də dünya həyatında bol nemət vermişdik:

يَاْكُلُ مِمَّا تَاْكُلُونَ مِنْهُ وَيَشْرَبُ مِمَّا تَشْرَبُونَ ﴿٣٣﴾
Yediyinizdən yeyir, içdiyinizdən də içir.

وَلَئِنْ اَطَعْتُمْ بَشَرًا مِثْلَكُمْ اِنَّكُمْ اِذًا لَخَاسِرُونَ ﴿٣٤﴾
əlbəttə, siz o zaman ziyana uğramış olarsınız.← Əgər sizin kimi olan bir insana itaət etsəniz,

اَيَعِدُكُمْ اَنَّكُمْ اِذَا مِتُّمْ وَكُنْتُمْ تُرَابًا وَعِظَامًا اَنَّكُمْ مُخْرَجُونَ ﴿٣٥﴾
siz (qəbirlərinizdən) çıxarılacağınız? ← O sizə vəd edirmi ki, ölüb torpaq və sür-sümük olduğunuzda,

هَيْهَاتَ هَيْهَاتَ لِمَا تُوعَدُونَ ﴿٣٦﴾
Vəd olunduğunuz şey çox uzaqdır, çox uzaq! (Bu, qeyri-mümkündür!)

اِنْ هِيَ اِلَّا حَيَاتُنَا الدُّنْيَا نَمُوتُ وَنَحْيَا وَمَا نَحْنُ بِمَبْعُوث۪ينَ ﴿٣٧﴾
(Birimiz) ölürük, (birimiz) dirilirik. (Təkrar) dirildiləcək deyilik! ← Bizimki ancaq bu dünya həyatımızdır.

اِنْ هُوَ اِلَّا رَجُلٌ افْتَرٰى عَلَى اللّٰهِ كَذِبًا وَمَا نَحْنُ لَهُ بِمُؤْمِن۪ينَ ﴿٣٨﴾
Biz ona iman gətirən deyilik!” ← Bu, sadəcə olaraq Allaha yalandan iftira yaxan bir adamdır.

قَالَ رَبِّ انْصُرْن۪ي بِمَا كَذَّبُونِ ﴿٣٩﴾ قَالَ عَمَّا قَل۪يلٍ لَيُصْبِحُنَّ نَادِم۪ينَ ﴿٤٠﴾
(Allah) dedi: “Bir azdan mütləq peşman olacaqlar!”← (Peyğəmbər) dedi: “Ey Rəbbim! Məni yalanlamalarına qarşı mənə kömək et!”

فَاَخَذَتْهُمُ الصَّيْحَةُ بِالْحَقِّ فَجَعَلْنَاهُمْ غُثَٓاءً
Və onları, sel üstündəki saman çöpünə döndərdik. ← Həqiqətən, qorxunc səs onları yaxaladı.

فَبُعْدًا لِلْقَوْمِ الظَّالِم۪ينَ ﴿٤١﴾ ثُمَّ اَنْشَاْنَا مِنْ بَعْدِهِمْ قُرُونًا اٰخَر۪ينَ ﴿٤٢﴾
Sonra onların arxasınca başqa nəsillər yaratdıq. ← Zalım tayfa uzaq olsun!

مَا تَسْبِقُ مِنْ اُمَّةٍ اَجَلَهَا وَمَا يَسْتَاْخِرُونَ ﴿٤٣﴾
Heç bir ümmət öz əcəlini nə qabaqlaya bilər, nə də yubada bilər!

ثُمَّ اَرْسَلْنَا رُسُلَنَا تَتْرًا كُلَّمَا جَاءَ اُمَّةً رَسُولُهَا كَذَّبُوهُ
Hər ümmətə öz peyğəmbəri gəldikcə onu yalanladılar. ← Sonra ardı ardına peyğəmbərlərimizi göndərdik.

فَاَتْبَعْنَا بَعْضَهُمْ بَعْضًا وَجَعَلْنَاهُمْ اَحَادِيثَ فَبُعْدًا لِقَوْمٍ لَا يُؤْمِنُونَ ﴿٤٤﴾
İman gətirməyən bir tayfa uzaq olsun! ← Biz də onları bir-birinin ardınca məhv edib əfsanələrə döndərdik.

ثُمَّ اَرْسَلْنَا مُوسٰى وَاَخَاهُ هٰرُونَ بِاٰيَاتِنَا وَسُلْطَانٍ مُبِينٍ ﴿٤٥﴾
ayələrimizlə və açıq-aşkar bir dəlillə, ← Sonra Musanı və qardaşı Harunu göndərdik,

اِلٰى فِرْعَوْنَ وَمَلَائِهِ فَاسْتَكْبَرُوا وَكَانُوا قَوْمًا عَالِينَ ﴿٤٦﴾
Onlar təkəbbürləndilər və özlərini yuxarı tutan bir camaat oldular, ← Firona və onun əyanlarının yanına.

فَقَالُوا اَنُؤْمِنُ لِبَشَرَيْنِ مِثْلِنَا وَقَوْمُهُمَا لَنَا عَابِدُونَ ﴿٤٧﴾
Halbuki onların tayfası bizim qullarımızdır.” ← və dedilər: “Özümüz kimi iki insanamı iman gətirəcəyik?

فَكَذَّبُوهُمَا فَكَانُوا مِنَ الْمُهْلَكِينَ ﴿٤٨﴾
Beləliklə, onları yalançı saydılar və həlak edilənlərdən oldular.

وَلَقَدْ اٰتَيْنَا مُوسَى الْكِتَابَ لَعَلَّهُمْ يَهْتَدُونَ ﴿٤٩﴾
Həqiqətən, Biz Musaya kitabı (Tövratı) verdik ki, bəlkə, (İsrail oğulları) doğru yola yönəlsinlər!

وَجَعَلْنَا ابْنَ مَرْيَمَ وَاُمَّهُ اٰيَةً وَاٰوَيْنَاهُمَا اِلٰى رَبْوَةٍ ذَاتِ قَرَارٍ وَمَعِينٍ ﴿٥٠﴾
Onları rahat və suyu olan bir təpədə yerləşdirdik.← Məryəm oğlunu və anasını da bir möcüzə etdik.

يَا اَيُّهَا الرُّسُلُ كُلُوا مِنَ الطَّيِّبَاتِ وَاعْمَلُوا صَالِحًا اِنِّي بِمَا تَعْمَلُونَ عَلِيمٌ ﴿٥١﴾
Mən həqiqətən, etdiklərinizi bilirəm! ← Ey peyğəmbərlər! Təmiz nemətlərdən yeyin və yaxşı işlər görün!

وَاِنَّ هٰذِهِ اُمَّتُكُمْ اُمَّةً وَاحِدَةً وَاَنَا رَبُّكُمْ فَاتَّقُونِ ﴿٥٢﴾
Mən də sizin Rəbbinizəm. Elə isə, məndən qorxun!” ← Şübhəsiz, bu bir ümmət olaraq sizin ümmətinizdir.

فَتَقَطَّعُوا اَمْرَهُمْ بَيْنَهُمْ زُبُرًا كُلُّ حِزْبٍ بِمَا لَدَيْهِمْ فَرِحُونَ ﴿٥٣﴾
Hər firqə əlindəki ilə sevinir. ← Amma onlar işlərini aralarında parçalayıb kitablara (ayırdılar).

فَذَرْهُمْ فِي غَمْرَتِهِمْ حَتّٰى حِينٍ ﴿٥٤﴾ اَيَحْسَبُونَ اَنَّمَا نُمِدُّهُمْ بِهِ مِنْ مَالٍ وَبَنِينَ ﴿٥٥﴾
Zənn edirlər ki, özlərinə verdiyimiz mal və övladlarla, ← Onları bir müddətə qədər şaşqınlıqları içində burax!

نُسَارِعُ لَهُمْ فِي الْخَيْرَاتِ بَلْ لَا يَشْعُرُونَ ﴿٥٦﴾
Xeyr, onlar anlamırlar! ← onların yaxşılıqlarına tələsirik?

اِنَّ الَّذِينَ هُمْ مِنْ خَشْيَةِ رَبِّهِمْ مُشْفِقُونَ ﴿٥٧﴾
Həqiqətən, Rəbbinin qorxusundan tir-tir əsən kəslər;

وَالَّذِينَ هُمْ بِاٰيَاتِ رَبِّهِمْ يُؤْمِنُونَ ﴿٥٨﴾ وَالَّذِينَ هُمْ بِرَبِّهِمْ لَا يُشْرِكُونَ ﴿٥٩﴾
Rəbbinə şərik qoşmayan kəslər; ← Rəbbinin ayələrinə inanan kəslər;

kimi, Ziya Bünyadov və Vasim Məmmədəliyevin birlikdə hazırladığı Qurani Kərim və Məalını göstərmək olar. Bununla yanaşı, Nəriman Qasımoğlu, Məmmədhəsən Qənioğlu-Tariyel Bilaloğlu və Əlixan Musayevin ayrı-ayrılıqda hazırladıqları Qurani Kərim tərcümələri, son illərdə bu sahədə təlif edilmiş əsərlərdəndir.

Əlinizdəki bu əsərin, digər Qurani Kərim tərcümələrindən əsas fərqi odur ki, bu tərcümədən istifadə edən kimsə, Qurani Kərimdəki hər bir sözün ayrılıqdakı mənasını öyrənə bilər. Qurani-Kərimdəki sözlər əlbəttə zəngin mənalar ehtiva edir. Ancaq biz çalışdıq ki, kəlmələrin keçdiyi ayələrə ən uyğun mənası hansıdırsa onu verək. Beləcə Quran oxuyucusu, Qurandaki sözlərin mənalarını əzbərləyərək, daha sonra tərcümələrə baxmadan tək başına da ayələri başa düşməyə başlayar. Bunun üçün əlbəttə, Ərəb dilini müəyyən bir səviyyədə bilmək lazımdır.

Bu məqsədlə hazırlanan Qurani Kərim tərcümələri, digər İslam ölkələrində mövcud olmasına baxmayaraq Azərbaycan dilində qələmə alınmış belə bir əsər yox idi. Ümid edirik ki, əlinizdəki bu kitab bu boşluğu bir miqdar dolduracaq və Müsəlmanlan qardaşlarımız üçün faydalı olacaqdır.

Onu da qeyd edək ki, bu kitabın hazırlanmasında, başda Vasim Məmmədəliyev və Ziya Bünyadov tərəfindən hazırlanmış `Qurani-Kərim və Məalı`, Əlixan Musayevin `Qurani-Kərim və Tərcüməsi`, Türkiyə Dəyanət Vəqfi tərəfindən hazırlanan `Kurani-Kerim Meali`, Süleyman Ateşin `Kuran Meali`, Tefsiri Celaleyn, Yaşar Nuri Öztürkün `Kuran Meali` kimi əsərlərdən də istifadə edilmişdir.

Şübhəsiz ki, insanoğlu xətasız və nöqsansız deyildir. Nöqsansız və qüsursuz olan Uca Allahdır. Buna görə də, əlinizdəki bu kitabın tərcümə hissəsində, müəyyən xətalar olması da qaçınılmazdır. Siz dəyərli oxuyuculardan xahişimiz də odur ki, belə xəta və nöqsanlarla rastlaşsanız bizə bildirəsiniz.

Uca Allaha sonsuz şükürlər olsun ki, bu kitabı hazırlamağı hazırlamağı bizə nəsib eylədi. Allahu Təala bizi, Onun müqəddəs kəlamına sadiq və onunla əməl edən bəndələrindən eyləsin. Axirətdə də Qurani Kərimi bizə şəfaətçi qılsın. Amin!

Ələddin SULTANOV

ŞƏKİ - 2011